# Şagird şəxsiyyətinin sosiallaşması prosesində müasir təlim metodlarının rotasiyası

**Sahil Cəfərov**

**Müəllif:**
Sahil Cəfərov — Pedaqogika üzrə fəlsəfə doktoru, Lənkəran Dövlət Universiteti. E-mail: sahilceferov77@mail.ru.

**Açar sözlər:**
Sosiallaşma, inteqrativ, təhsil strategiyası, təlim formaları, təhsilin məzmun elementləri, interaktiv metodlar, pedaqoji işin təşkili, ünsiyyət tələbatı, fəaliyyət məhsulu, fikri fəaliyyət, qiymətləndirmə forması

**Annotasiya.** Məqalədə şagird şəxsiyyətinin sosiallaşmasını şərtləndirən müasir dərsin əsas imkanları barədə fikir və ideyalar irəli sürülüb, müasir dərsin təşkili formaları haqqında geniş izah verilib. Bundan başqa, müasir dərsin mərhələləri barədə və bu mərhələlərdə şagirdin fəallığının təşkili məsələləri qeyd olunub. Əsas diqqət şagird şəxsiyyətinin sosiallaşmasının istiqamətləndirilməsi probleminə yönəldilib. Burada şagirdin müasir dərsdə pedaqoji işin təşkili şəraitində ünsiyyət tələbatının ödənilməsi, habelə şagird kollektivində qarşılıqlı münasibətlər sisteminin yaradılması məsələləri qeyd olunmuşdur. Şagirdin şəxsi mövqeyinin önə çıxarılmasına istiqamətlənən proqramların fərdi xarakterdə tətbiqinə zərurət ondan irəli gəlir ki, bu şəraitdə hər bir təhsilalanın biliyinin fərdi inteqrasiyasına münbit sosial-pedaqoji zəmin formalaşır. Qeyd etmək lazımdır ki, pedaqoji işə bu cür yanaşma təhsildə davamlı perspektivlərə yol açır. Pedaqoji işin qeyd etdiyimiz mahiyyətdə aparılması həm də təhsilin məzmun elementlərinin və dərsin strukturunun ayrı-ayrı mərhələlərinin pedaqoji-psixoloji əsasda sosial-məntiqi cəhətdən əlaqələndirilməsinə imkan verir. Məqalədə həm də təlimin keyfiyyətinin yüksəldilməsi yolları barədə geniş elmi yanaşmalar və praktik nümunələr göstərilmişdir.

**DOI:**
**Məqaləyə istinad:** Sahil Cəfərov. Şagird şəxsiyyətinin sosiallaşması prosesində müasir təlim metodlarının rotasiyası. *«Azərbaycan məktəbi» jurnalı.* № 2, 2018. səh. 61–74

**Məqalə tarixçəsi**
Göndərilib: 04.07.2018; Qəbul edilib: 19.09.2018; Nəşr edilib:

# Rotation of the modern teaching methods in the process of student socialization

**Sahil Jafarov**

**Author:**
Sahil Jafarov,
PhD in Pedagogy,
Lankaran State University.
Azerbaijan. E-mail:
sahilceferov77@mail.ru

**Keywords:**
Socialization, integrative education strategy, relations system, teaching forms, content elements of pedagogical work, intercourse demand, activity, evalution form, exchange of opinion.

**Abstract.** The article deals with the opinion and ideas about the main opportunities of modern lesson and the reason of socialization of student personality.The organization forms of modern lesson have been explained widely. Besides it, it has been noted about the stages of modern lesson and the problems of the organization of activeness of students in these stages. The main attention has been directed to the problem of the direction of socialization of student personality in the article, there have also been noted the problem of the organization of pedagogical work at modern lesson, and the creation of mutual relation system in student collective. Extensive scientific approaches and practical examples have been shown about the ways of increasing of teaching quality in the article. It should be noted that this kind of approach to pedagogical work contributes to continuous perspectives in education. The essence of the pedagogical work is the content of education it will create conditions for the social-logical coordination of the individual stages of the structure of the textbook on pedagogical-psychological basis. The article also presents extensive scientific approaches and practical examples of ways to improve the quality of education.

**DOI:**
**To cite this article:** Sahil Jafarov. Rotation of the modern teaching methods in the process of student socialization. *Azerbaijan Journal of Educational Studies.* No2, 2018. pp. 61–74

**Article history**
Received: 04.07.2018; Accepted: 19.09.2018; Published:

## Giriş

Təlim strategiyası dedikdə tədris prosesində istifadə olunan forma, üsul, vasitə və yanaşmaların məcmusu başa düşülür. Həmin strategiyanın məzmunu, ilk növbədə, təlim formalarında yeni perspektivlərə yol açır. Sosial-pedaqoji planda təlim formaları aşağıdakı kimi sistemləşdirilir.




Təlim formalarının ilkin və sadə mərhələsi ***«Fərdi iş»*** formasıdır. «Fərdi iş» şagirdin fəaliyyətini izləmək, potensial imkanlarını müəyyənləşdirmək və inkişaf etdirmək məqsədi daşıyır [Qəhrəmanov A. 2012; Veysova Z.A. 2012]. Şagirdin müstəqil fəaliyyəti üçün elmi-pedaqoji və metodik imkanlar yaradıldıqda həm onun tədqiqatçılıq qabiliyyəti, həm də daxili potensialı artır. Böyük alman pedaqoqu P.Natorpun qeyd etdiyi kimi, «...nəticədə insan artıq kənar şəxslərin deyil, daxili potensialının hesabına cəmiyyətdə fəal mövqe qazanır, formalaşır və mükəmməl sosiallaşma yolunu keçir» [ Əlizadə Ə., Bayramov Ə. 2003, s.176].

«Fərdi iş» zamanı şagirdin idraki və psixomotor imkanları genişlənir, onun kommunikativ bacarıqlarının formalaşması üçün pedaqoji və psixoloji zəmin formalaşır, ünsiyyət qurmağa mənəvi-psixi cəhətdən hazırlıq təmin olunur. «Fərdi iş» formasının reproduktiv xarakter daşıması, yəni şagirdlərə verilən tapşırıqlarda müstəqil tədqiqat və yaradıcılıq xarakterinin olması nəticəsində onların istifadəsi öz növbəsində lazım olan sərbəst və yaradıcı düşünmə qabiliyyətli keyfiyyətlərini inkişaf etdirməyə şərait yaradır [Ağayev Ə. 2006, s.145 ]. Buna görə də bir çox hallarda bu iş formasının xarakterik elementləri tədqiqatçılıq və yaradıcılıq prinsipləri ilə zənginləşdirilməlidir.

## Məqsəd və metodologiya

«Fərdi iş» forması şagirdin yaradıcı və kreativ mahiyyətdə inkişaf edən şəxsiyyət kimi formalaşmasına çox geniş sosial-pedaqoji perspektivlər açır. Sosial psixologiyadan bizə məlumdur ki, yaradıcılıq fenomeni sosiallaşmanın mühüm şərtinə çevrilmiş elementlər sırasındadır. İnsan psixologiyasında qazanılan keyfiyyətlərin ictimai bazası çoxaldıqca həmin xüsusiyyətlərin sosial mahiyyətinə kreativ zonalarda təzahür olunur. Sonrakı mərhələlərdə əvvəlki təcrübə ilə yeni qazanılacaq təcrübənin assosiasiyası baş verir. Assosiasiyanın gedişinin kəsb etdiyi istiqamət yaradıcılığın tələbatları və motivləri səviyyəsinə tabe olaraq daha optimal səviyyənin qət olunmasını labüdləşdirir [Qəhrəmanov A. 2012, Zamanova M. 2017]. Deməli, qarşılıqlı münasibətlər şəraitində yaradıcılıq psixologiyasının spesifik xüsusiyyətləri ondan ibarətdir ki, bu tendensiya ictimai situasiya yaranan kimi assosiasiyaların adi gedişindən kənara çıxır. Bu iş formasının tətbiqinə və istifadəsinə üstünlük verildikdə dərsdə vaxt itkisinin qarşısı alınır, çünki bu prosesdə eyni zamanda, sinif kollektivinin hər bir üzvü öz üzərinə düşən akademik məsuliyyəti hiss edərək düşünür və uğurlu nəticə almağa çalışır. Onu da qeyd etməliyik ki, sinif kollektivinin hər bir üzvündə müstəqil fəaliyyət mexanizminin yaradılması məsuliyyəti bilavasitə müəllimin üzərinə düşür. Müəllim məhz

bu şəraitdə metodiki normalar səviyyəsində təşkilatçılığı bacarsa, şagirdlərin idrak fəaliyyətində modelləşdirmə, müzakirə və müstəqil qərar qəbul etmə əmsalı lazımi səviyyədə olacaq, nəticədə sinif kollektivinin birgə fəaliyyəti üçün dinamik sosial-pedaqoji mühit yaranacaq. Buna görə də qeyd etmək lazımdır ki, müasir təlim strategiyası real həyati şəraiti əks etdirən zəngin sosial-pedaqoji elementlərdən formalaşdırılsa, müasir şəxsiyyət modelinin zəruri strukturunun ilkin təməli qoyular.

***«Cütlərlə iş».*** Təlim işində «Cütlərlə iş» formasından istifadə zamanı şagirdlər cüt-cüt qruplaşaraq müəyyən nailiyyətlər əldə edirlər [Abdulov R. 2005, Ağayev Ə. 2006, Əlizadə H. 1998]. «Cütlərlə iş» formasında fərdi iş formasına nisbətən şagird fəaliyyətinin məzmunu genişlənir. Bu prosesdə fəaliyyətin növü təlim olsa da, şagirdlərdə həm də qarşılıqlı ünsiyyət bacarıqlarının formalaşmasına geniş sosial-pedaqoji zəmin yaranır: İlk növbədə, müəllim-şagird əməkdaşlığı yeni mahiyyətdə qurulur; dərsdə görüləcək işin ağırlıq dərəcəsinin və mərkəzinin tədricən şagirdin üzərinə köçürülməsinə şərait yaranır; pedaqoji prosesin ənənəvi qaydalardan xilas olunaraq interaktiv formalar qazanmasına elmi-metodiki zəmin yaranır. «Cütlərlə iş» formasının tətbiqi prinsip etibarı ilə bir neçə istiqamətlər üzrə sosial-pedaqoji faydalar verir. Həmin istiqamətlərin aşağıdakı formalarda tətbiq olunmasını məqsədəuyğun sayırıq.

- Şagirdlər hər hansı tapşırığın həlli prosesində bir-birlərinə pedaqoji yardım edir, fərdi fəaliyyətdən birgə fəaliyyətə keçid alırlar. Şagird yalnız ona məxsus olan təbii imkanlara, xüsusiyyətlərə, fərdi qabiliyyətlərə və məqsədlərə malik olan, fəal və sərbəst hərəkət edən, qərarlar qəbul edən subyektiv yanaşma statusundan birgəfəallıq statusuna keçid alır və şəxsi mövqe nümayiş etdirir. «Cütlərlə iş» formasında müəllim və şagirdlərin müəyyən qaydada və rejimdə həyata keçirilən birgə fəaliyyətinin sosial-pedaqoji ifadəsi üzə çıxır. Sosial səbəblər və didaktik sistemlərin innovatik təhlili onu deməyə əsas verir ki, «cütlərlə iş» formasının düzgün qurulması və istifadəsi nəticəsində ciddi reqlamentə, sərt pedaqoji qaydalara əsaslanan standart dərslər tədricən öz yerini qeyri-standart dərslərlə əvəzləyir. Bu baxımdan, qarşılıqlı müzakirələrin ilkin fazasını təşkil edən «cütlərlə iş» forması istər sosial-pedaqoji, istərsə də mənəvi-psixoloji baxımdan bütün parametrlər üzrə təhsil işinin məqsədinə tam uyğun gələn təlim formalarından biridir.
- Şagirdlərlə cari verilən tapşırıqların müzakirəsindən başqa, ev tapşırıqlarının yerinə yetirilməsi və ya müzakirəsi barədə də qarşılıqlı məsləhətləşmələr və fikir mübadilələri aparılır. Bu prosesdə əsas elementlər idraki təlim və real həyati problemlərin həlli ilə bağlı əməkdaşlığın əks etdirilməsi və tapşırıqların həlli zamanı mümkün metod və üsullardan istifadənin təmin olunması ilə bağlıdır. Cütlərin məzmun sahəsi üzrə düşünmə prosesinin sürətlənməsində interaktiv mühitin nümayiş etdirdiyi effektivlik onların təlimi və ünsiyyəti üçün sosial-pedaqoji ölçü rolunu oynayır. İki şagirdin qarşılıqlı, interaktiv şəkildə fəaliyyəti zamanı müxtəlif məzmunlu yanaşmalardan yaranan əsas çətinlik təlimə nəzarəti qarşı tərəfə doğru yönəldərkən əmələ gəlir [Плоткин М.М. 2003, Шишов С. 1999]. Buradan belə bir qənaətə gəlmək olur ki, pedaqoji işin təşkili zamanı təlim məqsədləri birmənalı olaraq təhsilin məzmununun mənimsənilməsinə deyil, həm də situativ, interaktiv, perspektiv, şərti, ilkin və modern strukturda formalaşdırılmalıdır ki, şagirdlərin qarşılıqlı ünsiyyətinin davamlılığı üçün rəngarəng sosial-pedaqoji mühit yaransın. Təlimin məqsədi düzgün və dəqiq normalar səviyyəsində seçildikdə şagirdlərin özlərinin hiss etdikləri tələbat və ehtiyaclara görə yeni və davamlı fəaliyyət forması yaranır.
- «Cütlərlə iş» formasında şagirdlər qarşılıqlı qiymətləndirmə və qarşılıqlı yoxlamalar keçirəndən sonra fəaliyyət məhsullarını müəllimə təqdim edirlər. Təlimin mükəmməl forması kimi «cütlərlə iş» formasında iki şagird cütlər üçün müəyyənləşmiş tapşırığın həlli

prosesində qarşılıqlı nəzarət və qiymətləndirməni həyata keçirir. Burada sosial-pedaqoji əhəmiyyəti ilə seçilən əsas məsələ nəzarətin və qiymətləndirmənin formal şəkildə olsa da, şagird tərəfindən həyata keçirilməsidir. Belə ki, şagirdlər öz aralarında nəzarət və qiymətləndirmə apardıqda həmyaşıdlar mühitində qarşılıqlı yoxlamanın sosial-pedaqoji missiyası həyata keçirilir. Məhz bu tendensiya şagirdin şəxsiyyətyönümlü istiqamətdə formalaşmasını xarakterizə edən mühüm elementdir. Burada həm də dərsə ayrılan akademik saata qənaət məsələsi də qorunur. Şagirdin nailiyyəti əvvəlcə sinif yoldaşı tərəfindən nəzərdən keçirilir, ilkin nəticə olaraq qiymətləndirilir və sonradan müəllimə təqdim olunur. Şagirdin fəaliyyəti sinif yoldaşı tərəfindən səhv qiymətləndirilə bilər, buna baxmayaraq şagirdlərarası fikir mübadiləsinin aparılması vacibdir. Çünki qarşılıqlı fikir mübadiləsi nəticəsində şagirdlərdə tənqidi baxış və qiymətləndirmə vərdişi formalaşır və bu vərdiş əsasında şagird müstəqil olaraq öz nailiyyətlərinə tənqidi yanaşa bilir və ilkin qiymətləndirməni aparır.

***«Qruplarla iş».*** Pedaqoji ədəbiyyatda qeyd olunduğu kimi, «qruplarla iş» formasında şagirdlər müəyyən problemi həll etmək üçün üç və altı say tərkibində olmaqla müəyyən qruplarda birləşirlər. Bu şəraitdə onlar müzakirə etmə, fikir mübadiləsi aparma, mühakimə yürütmə və birgə fəaliyyət bacarıqlarını inkişaf etdirmə imkanlarını əldə edirlər. Məhz pedaqoji işin təşkilində əsas önəm şagirdin fəaliyyətinə verilir. Kurikulum sisteminin əsas prinsiplərindən biri də şagird nailiyyətinin qiymətləndirilməsi olduğu üçün burada şagirdin fəaliyyətinə geniş sosial-pedaqoji zəmin yaradılmalıdır. Bu isə o zaman mümkündür ki, şagirdin dinamik fəaliyyətini istiqamətləndirməkdən ötrü təhsildə konkret məzmun standartları müəyyənləşsin. Ümumtəhsil sahəsində qəbul edilən belə standartlar «qruplarla iş» formasının tətbiqi şəraitində öz pedaqoji səmərəsini verməkdədir. Daha dəqiq ifadə etsək, şagirdlərin ayrı-ayrı qruplarda birgə fəaliyyəti zamanı müxtəlif fənlər üzrə ümumi təlim nəticələrinin reallaşmasını təmin etmək üçün müəyyən edilən məzmunun zəruri hissəsi üzə çıxır, nailiyyət qarşılıqlı müzakirələrin obyektinə çevrilir. Təlim formalarının tətbiqi şəraitində kiçik qruplarda 3-6 şagirdin hansısa problemin həllinə yönəlmiş birgə, uzlaşdırılmış və sonu mükəmməl qərarlarla bitən fəaliyyəti aşkara çıxır. Bu baxımdan qrup üzvlərində düşünmə imkanlarının inkişaf perspektivlərinin, təlim prosesinin idraki və psixoloji əsaslarının, tapşırıqların həlli prinsiplərinin, qaydalarının, öyrənmə motivasiyasının, qarşılıqlı qiymətləndirmənin istiqamətlərinin yeni və müasir modeli yaranır. Nəticədə, şagirdlərdə birgə fəaliyyətin qrup formasının normaları müəyyənləşdikcə qarşılıqlı münasibətlərdə əlaqələndirici, istiqamətverici və inkişafetdirici qabiliyyətləri stimullaşdıran sosial-pedaqoji mühit formalaşır. Bu baxımdan təlimin təşkilinin qrup formasını fəal təlim şəraitində həm sosial, həm də pedaqoji işin əsas formalarından biri kimi dəyərləndirmək olar. «Qruplarla iş» formasında hər bir qrup üzvünü (şagirdi) fikri fəaliyyətə cəlb etməyə müvafiq sosial-pedaqoji mühitin şahidi oluruq. Bu şəkildə yerinə yetirilən işin məzmunu şagirdlərin idrak proseslərinin inkişafı üçün yeni dinamik şərait yaradır. Burada işin məzmun elementləri sosial-psixoloji və pedaqoji mahiyyətdə formalaşır. Qarşılıqlı müzakirələr şəraitində qoyulan problemin həlli yollarının tapılması cəhdi şagirdin psixologiyasının bütün laylarını hərəkətə gətirə bilir. İlk növbədə, məntiqi təfəkkür aktivləşir. Psixologiya elmindən bizə məlumdur ki, təfəkkür məqsədə yönəlmiş səciyyə daşıyır [Əlizadə H.Ə., Mahmudova R.M. 2013, İbrahimov F.N., Hüseynzadə R.L. 2013, Плоткин М.М. 2003]. Məntiqi təfəkkür hər şeydən əvvəl praktik fəaliyyət mühitini yaradaraq şagirdin qarşısında yeni məqsəd, yeni problem, yeni vəziyyət və yeni rəngarəng fəaliyyət şəraiti formalaşdırır. Bu baxımdan şagirdlər qrup daxilində verilən tapşırıqların təsiri nəticəsində yaranmış problem situasiya hesabına dinamik fəaliyyət göstərməyə meyilli olurlar. Problem situasiya

şəraitində şagirdlərdə təkmilləşmiş zehni fəaliyyətin köməyi ilə ümumi məqsədə çatmağa və tapşırıqları yerinə yetirməyə imkan verən yeni üsul və vasitələr tapmaq və yaratmaq, şəxsi yanaşmalardan istifadə etmək mümkün olur. İdrak fəaliyyəti yeninin axtarılması və kəşfidir. Yaranmış sosial-pedaqoji keçidlər öz növbəsində hər bir şagirddə təlim prosesində öz bacarığını nümayiş etdirməsi, özünə inamın artması, özünü tam dəyərli tərəf kimi dərk etməsi üçün daxili inam yaradır. Yaranmış problemin həlli üçün fərdin və qrup üzvlərinin fəaliyyətlərinin qarşılıqlı surətdə bir-birini tamamlaması hesabına hər bir şagird müstəqil şəxsiyyət kimi formalaşma yolunu keçir.

Şagirdin idrak fəaliyyətinin aktivləşməsi, əsasən, müasir dərsin ilkin mərhələsində - motivasiya mərhələsində reallaşır. Çünki əsas problem həmişə çoxsaylı fərziyyələr, ehtimallar doğurur və bunları yoxlamaq üçün, ilk növbədə, dərsdə mövzunun mənimsənilməsinə xidmət edən tədqiqat sualları düzgün və məntiqli tərtib olunmalıdır. Problem və tədqiqat sualı yeni biliklərin əldə olunmasına aparan «bələdçi» rolunu oynayır. Fəal təlimin birinci mərhələsində dərsin mexanizmi elə qurulmalıdır ki, məhz müzakirəyə çıxarılan problem şagirdin idrak fəallığının aktivləşməsinə zəmin yaratsın. Qrup formasında tədqiqatın birgəfəaliyyət şəklində aparılması sosial, pedaqoji və psixoloji cəhətdən müxtəlif məzmunlu faydalar verir:

1) ilkin olaraq şagirdin bilik, bacarıq və vərdişlərinin həcmi və xarakteri çoxaldıqca onlarda yeni məqsəd, məzmun və xarakter əlamətləri formalaşır.

Qeyd etdiyimiz vəziyyətlərdə şagirdlərdə təhsilin məzmun elementləri formalaşdıqca onların şəxsiyyət keyfiyyətləri də artır. Deməli, əsas məqsəd həyata keçir. Şagird qrup tərkibində, həmyaşıdlar şəraitində yeni nailiyyətlər qazanır, öyrənir, öyrədir, rəqabətə girir və əhəmiyyətli tərəf olaraq qrupun üzvü kimi formalaşır. Digər tərəfdən şagirdlər öz sinif yoldaşları ilə qarşılıqlı münasibətlərdə dönüş yaradır. Yəni qrupdaxili qarşılıqlı münasibətlərdə məzmun dəyişiklikləri baş verir. Təlim əsas fəaliyyət növünə çevrildikdən sonra şagirdlərarası qarşılıqlı münasibətlərin tərkibinə təhsilin məzmun elementləri daxil olur.

2) şagirdlərin qarşılıqlı münasibətlərinin həcmi və xarakteri təhsilin məzmun elementləri ilə təmin olunur.

Dərs prosesində şagirdlərin ünsiyyət tələbatının ödənilməsi məsələsi qrupdaxili qarşılıqlı münasibətlərin məzmunu ilə reallaşır. Burada şagird-şagird münasibətləri aparıcı olur. Təbii haldır ki, ümumi təhsilin məzmunu fərdin, cəmiyyətin, dövlətin maraq və tələbatlarını, milli və ümumbəşəri dəyərləri əks etdirməklə, humanistlik, dünyəvilik, varislik, inteqrativlik prinsipləri əsasında müəyyən olunur [Ağayev Ə. 2006, Ağayev Ə.Ə. 2005, Əlizadə H.Ə., Mahmudova R.M. 2013]. Təhsilin məzmun elementləri fərd ilə cəmiyyət arasında və eyni zamanda, fərdin tələbatları ilə dövlət arasında ictimai rabitə yaratmaqla təhsil alanların intellekt səviyyəsini qaldırır. Bu mənada ümumi təhsilin məzmunu təhsilalanların yaş, fizioloji, psixoloji xüsusiyyətlərini nəzərə almaqla onların dünyagörüşünün və şəxsiyyətinin formalaşmasını, bazar münasibətlərinin tələblərinə uyğun olaraq zəruri bilik və bacarıqlara yiyələnməsini, əqli, fiziki, mənəvi, estetik inkişafını, müstəqil əmək və təhsil həyatına hazırlanmasını, cəmiyyətin faydalı və məhsuldar üzvünə çevrilməsini təmin edir. Həmin məqsədin həyata keçirilməsi üçün təhsilin məzmunu qarşılıqlı münasibətlərin mövzusuna yönəldilməli və təlim tapşırıqları subyektlər arasında əsas müzakirə obyektinə çevrilməlidir. Qrup daxilində birgə fəaliyyət aparıcı olsa da, müəyyən mənada şagird-şagird münasibətlərinin məzmunu şəxsi sosial münasibətlərin məzmunundan qaynaqlanır. Nəzərə almaq lazımdır ki, ünsiyyət prosesində hər bir şagird subyekt olaraq mövqe seçir. Buna uyğun olaraq, onların şüuru, motivlər sistemi, emosional aləmi digər şagirdlərin fəaliyyətinə təkan verən faktora çevrilir. Şagird psixikasında nəyə nail olacağı barədə düşünür, məntiqi təfəkkürünü fəaliyyətə cəlb edir və qərar vermək üçün nəticə çıxarır. Bu baxımdan şagirdin fəaliyyət istiqamətləri

də həmin məzmunda müəyyənləşir. Deməli, dərsdə tətbiq olunan təlim forması fəaliyyətin məzmununa, fəaliyyətin məzmunu isə qarşılıqlı münasibətlərin daxili elementlərinə bilavasitə təsir edir. Təlim prosesində sinif kollektivinin üzvləri arasındakı şəxsi ünsiyyət «qruplarla iş» formasında həcm və xarakter etibarı ilə genişlənir, yeni məqsəd, forma və məzmun qazanır [Плоткин М.М. 2003, s. 178]. Bir sözlə, müasir təlim metodlarının tətbiqi şəraitində şagirdlərarası qarşılıqlı münasibətlərin sosial-pedaqoji çəkisi artır. Bəs bu necə baş verir? Birinci halda (təlimin «fərdi iş» formasında) müəllim-şagird ünsiyyəti, ikinci halda (təlimin «cütlərlə iş» formasında) şagird-şagird ünsiyyətinin məhdud dairəsi, üçüncü halda (təlimin «qruplarla iş» formasında) şagird-şagird ünsiyyətinin qarşılıqlı münasibətlər sisteminin nisbətən genişlənmiş forması, dördüncü halda isə (təlimin «kollektivlə iş» formasında) şagird-şagird ünsiyyətinin sosial-pedaqoji istiqamətdə kollektiv birgəfəaliyyət sisteminin formalaşması baş verir. Bu tendensiyanın kollektiv münasibətlər sisteminə qədər genişləndirilməsi nəticədə şagirdin gələcəkdə cəmiyyətdə ümumi münasibətlər sisteminə qoşulmasına geniş sosial-pedaqoji imkanlar yaradır

Şagirdin ümumi fəaliyyətinin elementləri ilə birləşən və həmin birgə fəaliyyətə xidmət edən, kollektiv üçün xarakterik olan qrup ünsiyyəti həm təlim tapşırıqlarının yerinə yetirilməsində, həm də şəxsiyyət modelinin formalaşmasında əhəmiyyətli dərəcədə keyfiyyət dəyişikliklərini əldə edə bilir. Qrupdaxili ünsiyyət nümunəsində şagirdlərin fəaliyyət və qarşılıqlı münasibətlərindəki müxtəlifliyi, qarşılıqlı sosial təsirlərində rəngarəngliyi aydın şəkildə müşahidə etmək olur. «Qruplarla iş» formasının tətbiqi şəraitində şagirdin istifadə etdiyi məlumat mənbələri müxtəliflik təşkil edir. Təbii haldır ki, qrupdaxili birgə fəaliyyət şəraitində informasiya mübadiləsi mühiti yaranır. Şagird lazım olan informasiyanı əldə etdikcə həm sinifdə, həm məktəbdə və həm də məktəbdənkənar şəraitdə həmin informasiyaların sosial bazasında münasibətlərini quraraq cəmiyyətin aktiv üzvü kimi əhəmiyyətli tərəfə çevrilir. Şagird qazandığı məlumatların sosial-pedaqoji kompleksini qorumaqla şəxsiyyət strukturunun vacib elementlərini formalaşdırır. Şagirdin istifadə etdiyi məlumat mənbələrinə ailə, müəllim, şagird yoldaşı, dərslik, dərs vəsaiti, əyani və didaktik vasitələr, internet resursları, kütləvi informasiya vasitələri və gündəlik qarşılaşdığı insanlar daxildir. Məhz şagird məktəbdə daxil olduğu birgə fəaliyyət şəraitində müxtəlif mənbələrdən qazandığı məlumatların mübadiləsini aparır. Qrupları formalaşdırmaq üçün sosial, psixoloji və pedaqoji parametrlər dəqiq nəzərə alınmalı, qrup üzvlərinin akademik göstəriciləri də əsas sayılmaqla qrup formalaşdırılmalıdır ki, pedaqoji fəaliyyətin nəticəsi mükəmməl səviyyəyə qalxsın. Sosial, pedaqoji və psixoloji cəhətdən yaradılan adekvat mühitdə şagirdin həm digər şagirdlərlə ünsiyyəti, həm nailiyyət göstəriciləri, həm də təlimə həvəsini şərtləndirən qarşılıqlı sosial-pedaqoji əlaqələri formalaşır. Həmin əlaqələr müxtəliflik təşkil edir. Bura «face to fase» metodunun ənənəvi formaları «şagird-şagird», «müəllim-şagird», «müəllim-şagird-məktəb rəhbəri», «müəllim-şagird-valideyn», «məktəb rəhbəri-şagird-valideyn», «ailə-şagird», «dost-şagird», «tanışlar-şagird», «yol yoldaşı-şagird» və ən əsası, geniş planda «cəmiyyət-şagird» əlaqələri daxildir. Buna görə də pedaqoji işin təşkilində əsas şərt müvafiq sosial-psixoloji və pedaqoji mühitin yaradılması sayılır. Uşağın daxili qüvvələrini və imkanlarını inkişaf etdirmək üçün müvafiq sosial-pedaqoji şəraitin yaradılması qarşılıqlı əməkdaşlıq şəraitində reallaşır. Bir məsələni də qeyd etmək vacibdir ki, sosial-psixoloji və pedaqoji mühitin nəzəri-praktik tərəfləri sırasında onun növlərinin təsnifi aparıcılıq təşkil etməlidir. Bu məsələdən bəhs edən alimlərin fikrincə, sosial-psixoloji və pedaqoji mühit həm şagirdi müstəqil düşünməyə və nəticə çıxarmağa təhrik edir, həm də onu mənəvi aləmində əməkdaşlıq, birgə fəaliyyət istəyini və qabiliyyətini formalaşdırır [İbrahimov F.N., Hüseynzadə R.L. 2013, s. 10].

Təlim prosesində istifadə olunan «qruplarla iş» formasında mənimsədilməsi nəzərdə tutulan mövzunun son məqsədini, məqsədə çatmaq üçün yolları, bu yolların səmərəliliyini yoxlamaq üsullarını özündə birləşdirən, təhsil prosesi ilə bağlı olan bütün fəaliyyətlərin səmərəli və məqsədyönlü təşkilinə hərtərəfli imkan yaradan mühüm şərtlər mövcuddur. Bunu nəzərə alaraq müəllim, ilk növbədə, dərsin motivasiya mərhələsini mükəmməl qurmağa çalışmalıdır. Motivasiya mərhələsində şagirdləri dərsin mövzusu ilə yaxından tanış etməlidir. Həmin mərhələdə şagirdlərin məntiqi, tənqidi, yaradıcı təfəkkürü və tədqiqatçılıq vərdişlərini inkişaf etdirən tapşırıqların müəyyənləşməsi vacibdir. Təhsil sahəsindəki müxtəlif fəaliyyətlər təhsilalanların mənafeyinə, maraq və tələbatlarının ödənilməsinə, istedad və qabiliyyətlərinin, potensial imkanlarının inkişafına xidmət etməlidir. Verilən suallar açıq və məntiqli olmalıdır. Fasilitasiya zamanı konkret misallardan, müqayisə və tutuşdurma üsulundan, analogiyalardan istifadəyə şərait yaradılmalıdır. Qrup daxilində akademik göstəriciləri ən zəif olan şagirdi hərəkətə gətirmək üçün mənaca yaxın olan öyrədici və yönəldici suallardan istifadə olunmalıdır. Qruplarda iştirak edən şagirdlər arasında qarşılıqlı müzakirə mühiti yaratmaq lazımdır. Bunun üçün şagirdin deyə biləcəyi sözü və ya fikri onun nitqini kəsərək, əvəzinə müəllim tərəfindən ifadə olunması yolverilməzdir. Verilən suallar qarşısında aciz qalan şagirdə qrupun digər üzvləri yardımçı olmalıdır. Verilən suallarda əsas fikri analiz və sintez etməkdə qrupun bütün üzvləri fəallıq göstərsə sualların mahiyyəti şagirdlər tərəfindən qavranılar. Verilən suallara hazırlanan cavabları şagirdlər öz sözləri ilə sərbəst ifadə etməlidir ki, onlarda yazılı və şifahi nitq paralel olaraq inkişaf etsin. Bu nəticənin əldə olunması üçün dərsdə sosial-pedaqoji və psixoloji mühitin yaradılması xüsusi əhəmiyyət daşıyır. Fasilitasiya prosesində uşaqların cavablarını dəqiq dinləmək və təhlil etmək vacibdir. Çünki hər bir şagirdin fəaliyyət məhsulu digər şagirdlərin diqqət mərkəzində olur və müəyyən qədər təhlil olunur. Deməli, şagirdin idraki fəaliyyəti nəticəsində yaranmış ideya və fikirlər digər şagirdlərin növbəti fəaliyyətinə yeni interaktiv pedaqoji mühit yaradır. Yəni dərsdə təkcə dərslikdə olan materiallardan yox, həm də müxtəlif subyektlərin düşüncə məhsullarından istifadə olunduqda interaktivlik önə çıxır. Qarşı tərəflərin söylədikləri fikir və ideyalar çoxaldıqca dərsin akademik səviyyəsi çoxalır. Buna görə də əsas önəm və diqqət xüsusi pedaqoji ölçülər çərçivəsində şagirdin fəaliyyətinə yönəldilməlidir. Şagird dərs zamanı mövcud problemin həlli yolunda əldə etdiyi nailiyyətlər haqqında məlumatı və əks əlaqəni verməyi bacarmalıdır ki, həm özü düşünsün, həm də qarşı tərəfləri düşündürə bilsin. Bir sözlə, diskussiya mühiti təşkil olunmalıdır. Dərsdə hər bir şagirdin fikir və rəyi yeni biliyin və ideyaların aşkarlanmasına şərait yaratmalıdır. Qarşılıqlı müzakirə diskussiya mühiti yaradır. Diskussiya həm də ideyaların qarşı-qarşıya durmasını, interaktiv və deduktiv mühitin yaranmasını şərtləndirir [Шишов С. 1999, s.112]. Müzakirə diskussiyaya, diskussiya isə qarşılıqlı münasibətlərin tənqidi tərzdə davam etməsinə şərait yaradır.

Qrup daxilində şagirdlər qarşılıqlı diskussiya apararkən, ilkin olaraq motivasiya elementi dərsin sonuna qədər qorunmuş olur. Bu o deməkdir ki, şagirdlərin diqqəti dərsdə daim mərkəzləşmiş vəziyyətdə qalır. Dərsin əsas şərtlərindən biri kimi diqqətlilik sosial-pedaqoji cəhətdən faydalılığı ilə seçilir. Birinci növbədə diqqət motivasiyanın sosial-psixoloji göstəricisi olaraq xarakterizə olunur. Məlum fakt ondan ibarətdir ki, müasir dərsin ən mühüm və mürəkkəb mərhələlərindən biri də motivasiya mərhələsidir [Qəhrəmanov A. 2012, Zamanova M. 2017, Мардахаев Л.В. 2006]. Motivasiya təsadüfi olaraq dərsin birinci mərhələsi olaraq müəyyənləşməyib. Bu element hətta dərsin ilkin anından başalayaraq son mərhələyə qədər sosial-pedaqoji və psixoloji funksiyaların yerinə yetirilməsini şərtləndirir. Onu da qeyd etmək vacibdir ki, dərsin sonrakı gedişi məhz motivasiyanın nə dərəcədə qurulmasından

asılı vəziyyətdə qalır. Pedaqoji psixologiyada qeyd olunduğu kimi, diskussiyada bir sıra fərziyyələri törədən problemli vəziyyətin elementləri idrak motivasiyasının meydana gəlməsinə təsir göstərən əsas faktorlardır. Bundan başqa, dərsin ilkin mərhələsi kimi motivasiyanın yaradılması və uğurlu formada qorunması üçün sosial-pedaqoji və psixoloji şərtləri bilmək müəllimlər üçün vacibdir. Həmin şərtləri ən optimal səviyyədə müəyyənləşdirməyə çalışmışıq:

1. «Qruplarla iş» formasında verilən tapşırıqlar qrup üzvlərinin akademik səviyyəsinə uyğun seçilməlidir. Çünki motivasiyanı yarada biləcək vacib şərtlərdən biri tapşırıqların şagirdin anlaq səviyyəsinə uyğun olmasıdır. Həm məzmunlu və həm də motivasiya yarada biləcək tapşırıqların müəyyənləşməsi pedaqoji keyfiyyət göstəricilərinə bilavasitə müsbət təsir edir. Buna görə də, həmin materialların xüsusiyyəti cəlbedici, qeyri-adi, müəmmalı, gözlənilməz və ən əsası, müstəqil təfəkkür fəaliyyətinin təşkilinə şərait yarada bilməlidir.

2. Hər bir qrupa yanaşma mexanizmi fərqli olmalıdır ki, şagirdlərin aktivlik dərəcəsi artsın. Bu prosesdə xüsusi sosial-pedaqoji mühit yaranır. Şagird özünə qarşı xüsusi diqqət hiss etdikdə onun təlim fəaliyyətinə marağı artır. Bu nəticənin əldə olunması üçün müvafiq tədris mühiti vacib şərtdir. Müəllimin şagirdlərə yanaşma mexanizmi dinamik və planlı xarakter daşıdıqda pedaqoji prosesin bütün elementləri diqqət mərkəzində olur.

3. Qruplara verilən tapşırıqların təqdim olunma üsulları aşkar və stimullaşdırıcı xarakterdə olmalıdır. Müəllim ayrı-ayrı qruplara təlim tapşırıqlarını təqdim edərkən həmin tapşırğın həllinin uğurluluğuna inamını bildirməlidir. Yəni hər şagirddə özünəinam hissini yaratmaqla onları davamlı fəaliyyətə stimullaşdırmaq lazımdır. Qrupun gücünə inamını aşkar formada səsləndirdikdə şagirdlərdə dinamik fəaliyyət tərzi formalaşır. Bu prosesdə bütün şagirdlərin diqqəti təlim fəaliyyətinə mərkəzləşir.

4. Şagirdlər tərəfindən yerinə yetirilən fəaliyyətlərin məzmununa diqqət yetirmək və lazımi səviyyədə istiqamət vermək vacibdir. Bu məsələnin vacibliyi ondadır ki, şagirdin irəli sürdüyü fikir və ideyalardakı yanlış yanaşmalara diqqət yetirməyəndə dərsin sonuna qədər faydasız fəaliyyət davam edəcəkdir. Təbii olaraq dərsin keyfiyyəti müəllimin əsasən təşkilatçılıq qabiliyyəti ilə xarakterizə olunur. Dərsdə şagirdlərin fəaliyyəti aparıcılıq təşkil etsə də, fasilitator olaraq müəllim öz işinin keyfiyyətinə nəzarət etməsə, dərsin akademik səviyyəsi aşağı düşəcək və lazımi nəticə əldə olunmayacaq. Buna görə də dərsdə düzgün istiqamətin seçilməsi müəllimdən asılıdır. Yəni təkcə qrupları fəaliyyətə cəlb etmək yox, həm də qrupda iştirakçı olan hər bir şagirdin fəaliyyətinə, fikir və mülahizələrinə nəzarəti diqqət mərkəzində saxlamaq lazımdır.

5. Şagirdlərdə yaradıcı yanaşma imkanlarının inkişaf etdirilməsi vacibdir. Çalışmaq lazımdır ki, şagird dərslikdə və ya dərs vəsaitində qeyd olunan tədris materiallarını eyni formada deyil, məzmununu qorumaq şərti ilə fərqli formada təqdim etsin. Bu mexanizm sualları cavablandırarkən məzmunu qorumaqla yeni formalarda təqdimatın verilməsini tələb edir. Şagird şəxsi təfəkkür məhsulundan çıxış etməklə verilən tapşırıqları və sualları cavablandırsa daha yaxşı nəticə əldə olunar. Müəllim daim cəhd etməlidir ki, şagird sərbəst olaraq öz sözləri ilə təqdimat etməyi bacarsın. Çünki şəxsiyyət modelinin struktur vahidlərindən biri də insanın mövcud məsələlərə fərdi yanaşma bacarığıdır. Bu mənada, fərdi yanaşma, fərdi mövqe və fərdi ideyaların irəli sürülməsi şagirdin cəmiyyətin aktiv və potensiallı üzvü olaraq sosiallaşmasına şərait yaradır. Ən əsas şərt olaraq burada şagirdin özünütəsdiq misssiyası həyata keçmiş olur. Müəllim müvafiq sosial-psixoloji və pedaqoji mühiti yaratmağı bacarsa şagirdlərdə özünüreallaşdırma imkanları da baş qaldıra bilir. Bu tendensiyanın mexaniki quruluşu müəllim-şagird və şagird-şagird strukturu üzərində qurulur, lakin sosial-pedaqoji quruluşu isə qarşılıqlı münasibətlərin formalaşması ilə şərtlənir. Müəllim şagirdi, şagird

isə məxsus olduğu qrupdakı digər şagirdləri fəaliyyətə cəlb etdikdə daxili rəqabət mühiti yaranır, şəxsi fikir və mülahizələrin səslənməsinə şərait formalaşır. Həm pedaqoji nailiyyətlərin əldə olunması təmin olunur, həm də şagirdin sosiallaşmasının məzmun elementləri müəyyənləşir.

6. Müəllim tərəfindən fasilitasiya rolunun düzgün yerinə yetirilməsi şagirdlərin müvafiq pedaqoji yönümdə aktivliyini təmin edir və onları bir şəxsiyyət kimi formalaşdırır. Müasir dərsin əsas sosial-pedaqoji şərtlərindən biri də yüksək mənəvi keyfiyyətlərə malik olan şəxsiyyətin yetişdirilməsidir. Hər iki məqsədin həyata keçirilməsi üçün dərsdə verilən təlim tapşırıqları və sualları yönəldici xarakterdə tərtib olunmalıdır. Ənənəvi dərsdən fərqli olaraq müasir dərsdə müəllim tərtib etdiyi sual və tapşırıqların məzmununda yönəldici və istiqamətverici prinsipi gözləməlidir. Təlim prosesində qruplara ünvanlandırılan hər bir tapşırıq istər şagirdin şəxsi düşünmə imkanlarının, istərsə də qarşılıqlı diskussiya mühitinin yaradılmasının mühüm şərtinə çevrilməlidir.

7. Şagird nailiyyətlərinin qiymətləndirilməsi işində müəllim həm obyektivlik, həm sistematiklik və həm də aşkarlıq prinsipinə əməl etməlidir.

Bildiyimiz kimi, ənənəvi təlimdən fərqli olaraq müasir təlim formalarında şagirdə verilən qiymət şagirdin bilik səviyyəsini deyil, onun nailiyyət səviyyəsinə verilir. Yəni verilən qiymət təhsili idarə edən amil səviyyəsində qəbul olunan pedaqoji ölçü vahididir. Müasir dərsdə qiymətləndirmənin formalizmdən azad olunması həyati bacarıqların formalaşdırılmasını reallaşdırır [Qəhrəmanov A. 2012, s. 12]. İndiki cəmiyyətin sosial çağırışlarının əsasında məhz praktik həyati bacarıqları olan insan amilinin formalaşdırılması ideyaları durur ki, bu da cəmiyyətə modern dəyərlər əsasında fayda verə biləcək vətəndaşların yetişdirilməsini təmin edən mexanizmdir.

***«Kollektivlə iş».*** Təlimin «kollektivlə iş» forması həm fərdi, həm cütlərlə, həm də «qruplarla iş» formalarının kompleks elementlərini özündə birləşdirir. Təlimin qarşıya qoyduğu vəzifələrin və prinsiplərin həyata keçirilməsi təlim-tərbiyə prosesinə təsir edən amillərdən və şərtlərdən bilavasitə asılıdır. Təlimin «kollektivlə iş» formasında aparılan müzakirələrdə müxtəlif fərziyyələrin meydana çıxması, ilk növbədə, verilən tapşırıqların həllinin mükəmməllik dərəcəsini artırır. Kollektiv müzakirə müxtəsərlik, vaxta qənaət şərtlərini özündə birləşdirir. Belə vəziyyətlərdə şagirdlərdə kollektiv birgəfəaliyyət modeli formalaşır. Nəzərə almaq lazımdır ki, «kollektivlə iş» formasında müxtəlif təlim məqsədlərinə yönəlmiş bir sıra metod və texnikaların tətbiqi üçün sosial-pedaqoji şərait yaranır. «Kollektivlə iş» formasında tədqiqatın aparılması üçün hansı metodun lazım olduğunu müəyyən etmək üçün müəllim müasir təlim metodlarının əsas xüsusiyyətlərini diqqətlə nəzərdən keçirməli və dərsdə mövzunun məqsədinə uyğun olaraq metodlar seçməlidir. Metodu seçərkən hər bir şagirdin bilik, bacarıq və vərdişlərin mənimsənilmə səviyyəsinə, həm də onların şəxsiyyət olaraq sosiallaşmasına (şəxsiyyət tərəfindən ictimai dəyərlərin qazanılması) geniş şərait yaradılmalıdır. Yəni formalaşdırmaq və inkişaf etdirmək məqsədi təlimin qarşısında mühüm vəzifə olaraq daim nəzərə alınsa, yeni perspektiv nəticələrin əldə olunması reallığa çevriləcəkdir.

«Kollektivlə iş» formasının əsas üstünlüklərindən biri də şagirdlər arasında qarşılıqlı fəaliyyətə əsaslanan dinamik işin önə çıxarılmasından ibarətdir. Yəni kollektivin birgə fəaliyyəti dedikdə sadəcə olaraq qarşılıqlı təsir prosesi deyil, şagirdlərlə tədqiqat xarakterli xüsusi təşkil olunmuş idrak fəaliyyəti başa düşülür. Təlimin «kollektivlə iş» formasında tədrisin elə metodlarının tətbiqinə şərait yaradılır ki, həmin metodlar şagirdlərin tədris materialı ilə, eləcə də ətraf aləmin reallıqları və təzahürləri ilə sərbəst iş prosesində tanışlığına və istifadəsinə şərait yaranır. Tətbiq olunan müasir təlim metodları şagirdin nailiyyət səviyyəsinin yüksəldilməsini təmin edən ən mükəmməl vasitələrdəndir. «Kollektivlə iş» forması müəllimin bilavasitə iştirakı ilə

şagirdlərə müxtəlif informasiya mənbələri əsasında və ya bir-biri ilə qarşılıqlı ünsiyyət prosesində yeni bilikləri və həyati bacarıqları qazandırmağa imkan verən təlim üsullarını və dərsin təşkili formalarını özündə birləşdirən, pedaqoji fəaliyyətin səmərəli tərəflərini həyata keçirən ən mükəmməl təlim formalarındandır.

Fəal təlim metodlarına BİBÖ, layihələrdirmə metodu, karusel, anlayışın müəyyən edilməsi, akvarium metodu, kublaşdırma, ziqzaq, beyin həmləsi, klaster, venn diaqramı, auksion, söz assosiasiaları, diskussiya, ideyalar xalisi, refleksiya və s. metodlar daxildir [Qəhrəmanov A. 2012, Veysova Z.A. 2012]. Bu metodların təsnifatını daha da genişləndirmək olar. Yuxarıda qeyd etdiyimiz kimi, «kollektivlə iş» formasında həm də qarşılıqlı ünsiyyət vasitələrindən istifadə olunur. Şagird şəxsiyyətinin sosiallaşmasında ünsiyyət bilavasitə şagirdin fəallıq dərəcəsində ifadə olunur. Ümumi prizmadan yanaşdıqda isə istər təlim formalarında, istər fəal dərsin mərhələlərində, istərsə də müasir təlim metodlarının tətbiqi şəraitində yeni yanaşma mexanizmlərindən istifadəyə şərait yaranır. Çünki müasir dərs yeni şəxsiyyət modelinin formalaşmasında optimal vasitəyə çevrilmişdir. Burada aparıcı amil ünsiyyətdir. Ünsiyyət zamanı biliklərin, mənəvi dəyərlərin, fikirlərin və niyyətlərin mübadiləsi baş verir. Ünsiyyətin məzmunu həm də əhval-ruhiyyəni qaldırmaqda optimal vasitədir. Ünsiyyətin sosial-psixoloji mahiyyəti şagirdin hisslərinin ifadəsinə və intellektual səviyyəsinə bilavasitə təsir göstərir. Qarşılıqlı münasibətlər şəraitində şagirdlərin mədəni səviyyəsi, onun intellektinin inkişafı və dünyagörüşü meydana çıxır. Məhz müasir dərsin təşkili şagirdin idraki marağını oyatmaq və mövqelərin müdafiəsi üçün ən optimal vasitələri özündə birləşdirir. Şagirdin idraki maraqlarına dayaq olan təlimin bütün mərhələlərində istifadə oluna bilən mühüm vasitələrdən biri kimi qarşılıqlı münasibətlər sistemi çox böyük pedaqoji-psixoloji faydaları ilə şəxsiyyətin sosiallaşmasını müsbət yönümdə istiqamətləndirə bilir.

Məlum olduğu kimi, insanın sosiallaşması ictimai keyfiyyətlərin qazanılması və bu keyfiyyətlərin cəmiyyətə yenidən inteqrasiyası səviyyəsində reallaşır. İnsanın sosiallaşması ilkin olaraq ailədən başlayır, sonradan qohumların, məhəllənin, dostların, tanışların və ümumiyyətlə qarşılaşdığı tərəflərin əhatəsində davam edir. Qeyd olunan digər tərəflərin əksəriyyəti fərdi münasibət əsasında qurulsa da, sosiallaşma prosesinin böyük bir hissəsini kollektiv münasibətlər sistemi təşkil edir. Bu baxımdan insan əvvəl fərdi, sonra qrup, daha sonra kollektiv münasibətlər sisteminə inteqrasiya edərək ümumi cəmiyyətdə mövcud münasibətlər sisteminə qoşulma imkanlarını qazanır. Lakin bu mərhələlərin əsas hissəsini kollektiv münasibətlər sistemi təşkil edir. İnsan amilinin qarşılaşdığı kollektiv münasibətlər sisteminin ilkin və rəsmi forması sinif kollektividir.

Məktəb mühitinə daxil olduqdan sonra uşağın əhatəsində olduğu kollektiv münasibətlər sisteminin ilkin təzahür forması emosianal reaksiyalarda hiss olunur. Həmin reaksiyalar bəzi cərəyanetmə xüsusiyyətlərinə görə fərqlənir. Birinci növbədə hiss, iradə və xarakter etibarı ilə uşağın psixologiyasında sosiallaşmanın məzmunu dəyişilir. Uşaq psixologiyasının daxilində motivlərin müəyyən kompleksi uşağın kollektivin sosial-pedaqoji mühitinə uyğunlaşmasına imkan yaradır [Ağayev Ə.Ə. 2005, s.4]. Sinif kollektivinin təsiri altında aşkara çıxan mühüm cəhətlər sırasında psixi fəaliyyətin adaptasiyasında meyillilik artan tərzdə davam etməyə başlayır. Şagird şəxsiyyətinin sosiallaşmasında ictimai dəyərlərin ötürülmə sürəti və həcmi dəyişilir. Motivlərin kompleksi öz elementlərini kollektivin ayrı-ayrı üzvlərindən qazanır. Deməli, həm də uşağın sosiallaşmasında müxtəlifliyin əsası qoyulur. Təbii olaraq bu proseslər şagirdi öz şəxsi fəallığından məhrum etmir. Çünki şagird özü də sinif kollektivinin bir üzvü kimi sosial statusa malikdir. Lakin şagird şəxsiyyətinin sosiallaşmasına ictimai mühitin birbaşa təsirinin nəticəsi kimi baxılsa, bu proses məqsədəuyğun qiymətləndirilər, yox əgər mühitin surəti kimi baxılsa, bu daha məqsədəuyğun sayılar. Çünki burada şagirdin şəxsi

fəallığı inkar olunmur. Bu prosesin təhlilini dəqiq apardıqda məlum olur ki, şagird şəxsiyyətinin fəallığında sosial «mən» konsepsiyasının doğruluğu, dəqiqliyi üzə çıxır. Yəni şəxsi fəallığın özü ictimai mühitin təsiri altında aşkar olunur. Şagird öz xarakterində islahedici tədbirlər yerinə yetirdikdə davranışını və ünsiyyətini mövcud sosial-pedaqoji situasiyaya uyğunlaşdıra bilir. Əgər proses belə baş verməsə sosiallaşma prosesində uğurlu cəhətlər izah olunmamış qala bilər.

Sinif kollektiv münasibətlər sisteminin ilkin forması olaraq sosiallaşmanın inkişaf qanunauyğunluqlarını müəyyənləşdirən əsas mərhələlərdən biri kimi qəbul olunmalıdır. Şagird şəxsiyyətinin formalaşmasının bu mərhələsi həm onun təlim fəaliyyətinə, həm də onun qarşılaşdığı münasibətlərin məzmununa bilavasitə təsir edir. Sosiallaşmanın həmin mərhələsində şagirdin psixi inkişafının hərəkətverici qüvvələri öz funksional təsirlərini üzə çıxarır. Alman psixoloqu B.Şternenin təklif etdiyi mexaniki qarşılıqlı təsir və ya iki amil (mühit və irsiyyət) konvergiyası nəzəriyyəsi bilavasitə ictimai mühitin təsiri altında sosiallaşma faizinin şərtlənməsi problemini ortaya qoyur [Шишов С. 1999, s.42]. Alim təsdiq edir ki, qarşılıqlı münasibətlər sistemində insan psixologiyasının bütün layları hərəkətə gəlir. Münasibətlərin zaman ölçüləri uzandıqca yeni psixi xassələr hasil olur. Bu prosesdə insanın malik olduğu psixoloji keyfiyyətlərlə sosiallaşmanın kombinasiyası yaranır. Ünsiyyət növləri növbələşdikcə yeni psixi keyfiyyətlər aşkar olunur. Deməli, məktəbə daxil olandan sonra uşağın münasibətlər dairəsi genişləndikcə onun psixologiyasının sosial məzmunu yeni forma və standartlar ala bilir.

Sinif kollektivinin təsiri həm də şagirdin düşüncə sferasında buraxılan ictimai səhvlərin aradan qalxması ilə nəticələnir. Şagird müasir dərsin imkanları şəraitində qarşılaşdığı münasibətlər sisteminə qoşulmağa hər dəfə cəhd etdikdə öz daxili hərəkətverici qüvvələrinin xarakteristikasına müraciət edir, yenidən nəzər yetirir, məntiqi təfəkkürünü hərəkətə gətirir, təhlillər aparır və mükəmməl nəticə hasil edir. Münasibətlərin məzmunu, bir növ, şagird şəxsiyyətinin tipini müəyyənləşdirməklə yenidən sosial dövriyyə yaradır. Sosial dövriyyə təkrarlandıqca, sürətin intensivlik dərəcəsini artırdıqca özünəməxsus təhlil süzgəci yaradır və mənfi təsəvvürləri islah etməklə nəticələnir. Digər tərəfdən nəzər yetirdikdə görünür ki, sosiallaşma prosesinin daxili ziddiyyətlərinin xarakteristikasının təqdim olunması zəruridir. Çünki bu tendensiyanın doğruluğu tələb edir ki, müasir dərsdə sosiallaşmada maneələrin həlli perspektivləri həyata keçirilsin; sosiallaşma aktının ibtidai (sadə) formadan ali formaya (mürəkkəb məzmunlu psixi əməliyyatlara) keçid prosesini təmin etsin.

Şagird şəxsiyyətinin fəallıq dərəcəsini onun sosiallaşmasında dərk edilmiş və edilməmiş mürəkkəb motivlər sistemi təşkil edir. Həmin proses cəhdlər vasitəsi ilə, fəalliyyətə yenidən təhrik edən daxili tələbatların məcmusu ilə şərtlənir. Sosiallaşmanın uğurluluğu üçün daxili tələbatların subyekt tərəfdən təmin edilməsi prosesi özü də ziddiyyətli prosesidir. Burada şagirdin özünütəsdiq cəhətləri aparıcı faktor kimi hər an sosiallaşmanın məzmununda köklü dəyişikliklər yarada bilir. Müasir təlim forma və metodlarından istifadə zamanı sinif kollektivində yaranan münasibətlər diferensiallaşdıqca şəxsi mövqelər formalaşır. Sinif kollektivinin hər bir üzvü fərdi formada özünütəsdiq və özünüreallaşdırma idealında olur. Nəticədə, bəzən şagird qarşı tərəfin mövqeyini qəbul etmir. Bu səbəblərdən ziddiyyətlərin meydana gəlməsi qaçılmaz vəziyyətə çatır. Sinif kollektivində konfliktli şəraitin yaranması şagird şəxsiyyətinin sosiallaşma səviyyəsini tənəzzül həddinə çatdırır. Adətən, həmin vəziyyətin bərpa olunması üçün təlim metodlarının imkanlarından geniş və məqsədli istifadə olunmalıdır. Bu prosesi normal səviyyəyə qaldırmaqdan ötrü qarşıdurma vəziyyətində olan iki şagirdə eyni təlim tapşırığını verib, onlar arasında təlim tapşırığının müştərək həlli üçün müvafiq şərait yaratmaq olar. Digər yanaşmada eyni qrupa iki şagirdi daxil etməklə onlar arasında münasibətlərin yaranmasını təmin etmək

mümkündür. Bütün vəziyyətlərdə çıxış yolunun başlanğıcında sinif kollektivinin tərkibində qarşılıqlı münasibətlərin sağlamlaşdırılması məqsədi aparıcıdır.

Sosiallaşma prosesinin müvəffəqiyyətini təmin etmək üçün şagird şəxsiyyətinin inkişaf səviyyəsi ilə onun real təmin olunma mühiti arasında oxşar və fərqli elementləri müşahidə etmək vacibdir. Məsələn, şagird öz sinif yoldaşları ilə ünsiyyət tələbatını təlim tapşırığının həlli prosesində ödəyə bilər. Lakin bu şəraiti müəllim yaratmalıdır ki, şagird müvafiq uyğunluq prinsipləri əsasında lazım olan qrupda müzakirələrdə və disputlarda iştirak etsin. Belə hallarda şagird onun ünsiyyət tələbatını (təlim tapşırığının həllinə kömək prosesi) təmin edən digər şagirdi (sinif və ya məktəb yoldaşı) diskussiyadan sonra, həm də ünsiyyət tələbatını təmin etmiş şəxs kimi hafizəsində saxlayır. Sinif kollektivində şagirdin sosial tələbatları daha geniş dairəni əhatə etməsə də, bu tendensiya müvafiq yaş mərhələsi üçün sosiallaşmanın məzmununu kifayət dərəcədə təmin etmiş cəhət sayılır. Şagird üçün əhəmiyyətli olan obyektlər dairəsinin genişlənməsi sosiallaşmanın mahiyyətinin zənginləşməsi ilə nəticələnir. Nəzərə almaq lazımdır ki, sosiallaşmanın tərkib elementləri əks qütbdə yerləşmir. Burada təlim fəaliyyətinin məzmunundan maksimum istifadə etmək vacibdir. Təlim fəaliyyətinin imkanlarının sosial-pedaqoji məzmununun genişliyi sosiallaşmanın tərkibində əks qütbdə parçalanmanı yaratmır, əksinə tamlıq, bütövlük və vəhdət yaradır. Buradan məlum olur ki, sinif kollektivi şagirdin sosiallaşmasını şərtləndirən əsas mərhələ olaraq çıxış edir. Sinifdə mövcud qarşılıqlı münasibətlər şagirdin artan tələbatlarını təmin etməklə sosiallaşmanın mühüm mərhələsinə çevrilir. Burada münasibətlərin səviyyəcə daha yüksək formasının təzahür olunması şagird şəxsiyyətinə dəyərli, ictimai keyfiyyətlər qazandırır. Beləliklə, şagird şəxsiyyətinin sosiallaşmasında nailiyyətlərin əldə olunması ilə nəticələnən kollektivdaxili münasibətlər ictimai həyatda şagird fəallığında onun müəyyən icra vasitələrinin (fəndlərin, üsulların, əməliyyatların, bacarıqların, biliklərin və s.) mənimsənilməsi yolu ilə tamamlanır.

Şagird şəxsiyyətinin sosiallaşmasında sinif kollektivinin şərtləndirici vəzifəsi həm də onun fəaliyyət xüsusiyyətilərinin dinamikası haqqında fikirləri doğru hesab etməyə əsas verir. Şagird şəxsiyyətinin strukturunun təşkilində onun xassə və keyfiyyətlərinin inkişafında sosial məzmunun aparıcı olması həqiqətdir. Əgər eyni ictimai mühitdə - sinif kollektivində formalaşan münasibətlər arasında fərqlər mövcuddursa, deməli, sosiallaşmanın ayrı-ayrı istiqamətlər üzrə baş verməsi tendensiyası həqiqətdir. Bu zaman artıq sosiallaşmanın quruluş və fəaliyyətində dəyişikliklər hiss olunur. Şagirdin daxili xüsusiyyətlərindəki fərqlər onlarda eyni ictimai təsirin müxtəlif pedaqoji-psixoloji effektlərini yaradır. Məhz bu həssas məqamı yaranmış ziddiyyətlərin birinci səbəbi kimi qeyd etmək vacibdir. Əgər şagirdlərin müxtəlif ailələrdə, müxtəlif tərbiyəvi sistemlərdə böyüməsini nəzərə alsaq, onların sosiallaşmasında yaranan fərqləri təbii proses kimi qəbul etmək olar. Bu baxımdan, yaxın və uzaq coğrafiyalardan, fərqli sosial şəraitlərdən gələn şagirdləri eyni sinifdə, kollektiv formasında birləşdirən məktəb mühiti onların sosiallaşmasını məqbul səviyyədə təmin etmiş olur. Müəllim nəzərə almalıdır ki, sosiallaşmada baş verən tənəzzül, əsasən, şagirdin yaşadığı fərdi inkişaf şəraitindən asılıdır. Şagirdi əhatə edən makro, mezo və mikro mühit öz sosial təsir gücünü həmişə hiss etdirir. Yəni, ailənin övladları arasında yaş fərqi, sosial-iqtisadi şərait, övladlara qarşı fərqli münasibət (bir halda ilk uşağı, digər halda orta və ya kiçik uşağı çox əzizləmək) və ən əsas məsələlərdən biri kimi, müəllim-şagird və şagird-şagird münasibətlərinin məzmununda diferensial xarakter — bunların hamısı şagird şəxsiyyətində müxtəlif keyfiyyətlərin və xarakterin hasil olmasına sosial-pedaqoji şərait yaradır. Buna görə də, əksər vəziyyətlərdə şagirdin sosiallaşmasında həmin səbəblərdən inflyasiya həddi baş verir. Şagird şəxsiyyətinin sosiallaşmasının ictimai cəhətdən

şərtlənən proses olduğunu nəzərə alsaq burada müəllimlərin məqsədyönlü təsirini ön plana çəkmək daha doğru olardı.

Şagird şəxsiyyətinin sosiallaşmasının kollektiv şərtləri əxlaqi şüurun və mənlik şüurunun formalaşması ilə nəticələnir. Qazanılan ictimai keyfiyyətlər kollektivlə şagird arasında sosial rabitənin fonunda reallaşır. Deməli, sinif kollektivində sosiallaşma mübadiləsi baş verdikcə tədricən vahid istiqamət seçilir. Nəticədə sinif kollektivinin hər bir üzvü bəyənilən, seçilən və ictimai dəstək qazanan sosiallaşmanın məzmununu əxz edir. Bu tendensiyanı nəzərə alaraq müəllim, ilk növbədə, müasir təlim mühitini qurmaqla sinif kollektivində qarşılıqlı münasibətlərin məzmununu ictimai mahiyyətdə müşahidə etməyə səy göstərməlidir. Bu istiqamət şagirdlərdə öyrənməyə meyilliliyi artırır və sosiallaşmanın məzmun elementlərini özündə birləşdirir. Sosial pedaqogikanın əsas istiqamətlərindən birini təşkil edən təlim fəaliyyətində sosiallaşma aktı təkcə bilik, bacarıq və vərdişlərin mənimsənilməsi ilə məhdudlaşmamalıdır. Bu proses həm də sinif kollektivinin hər bir üzvünün sosiallaşmasını məqbul səviyyədə istiqamətləndirməlidir ki, şagirdlərdə özünütəsdiq və özünüreallaşdırma imkanları formalaşsın. Çünki əsas məqsədimiz, hərtərəfli inkişaf etmiş, mükəmməl bilik, bacarıq və vərdişlərə yiyələnən, intellektual səviyyəsi yüksək olan və ən əsası qarşılıqlı münasibətlər sistemində öz daxili potensialından istifadə etməklə inteqrasiya qabiliyyətini artıra bilən şagirdləri yetişdirməkdir. Müasir dərs məhz həmin məqsədin reallaşmasına istiqamətlənsə, biz cəmiyyətin indiki dinamik tələblərinə cavab verə bilən və bilavasitə sosial-iqtisadi və ictimai-siyasi proseslərdə aktiv iştirak edə bilən müasir şəxsiyyəti yetişdirməyə nail ola bilərik.

**İstifadə edilmiş ədəbiyyat**


1. Abdulov R. (2005) Məktəbdə sosial pedaqoji işin əsasları. Bakı.
2. Ağayev Ə. (2006) Təlim prosesi: ənənə və müasirlik. Bakı.
3. Ağayev Ə., Rzayeva Y. və b. (2008) Sosial pedaqogika. Bakı.
4. Ağayev Ə.Ə. (2005) Azərbaycan ictimai-pedaqoji fikrində şəxsiyyətin formalaşması problemi. Bakı, Avropa.
5. Əliyev B., Əliyeva K., Cabbarov R. (2014) Pedaqoji psixologiya. Bakı.
6. Əlizadə Ə., Bayramov Ə. (2003) Sosial psixologiya. Bakı.
7. Əlizadə H. (1998) Sosial pedaqogikanın aktual məsələləri. Bakı.
8. Əlizadə H., Mahmudova R. (2013) Sosial pedaqogika. Bakı.
9. Əlizadə H.Ə., Mahmudova R.M. (2013) Sosial pedaqogika. Bakı.
10. İbrahimov F.N., Hüseynzadə R.L. (2013) Pedaqogika. 2 cilddə. Bakı, Mütərcim.
11. İnteqrativ kurrikulum: Mahiyyəti və nümunələr. (2006) Müəllimlər üçün vəsait. Bakı, Adiloğlu.
12. Qəhrəmanov A. (2012) «Ümumi orta təhsil səviyyəsinin yeni fənn kurikulumlarının tətbiqi üzrə» təlim materialı. Bakı.
13. Mehrabov A.O. (2012) Müasir təhsilin metodoloji problemləri. Bakı, Mütərcim.
14. Pedaqogika fənninin kurikulumu. (2014) ADPU. Bakı, Elm və təhsil.
15. Veysova Z.A. (2012) Fəal/interaktiv təlim: müəllimlər üçün vəsait. Azərbaycan Respublikası Təhsil Nazirliyi.
16. Zamanova M. (2017) Təhsildə keyfiyyətin sistemli idarə edilməsi. Bakı, Elm və təhsil.
17. Джафаров С.Н. (2017) Социальные педагогические и психологические возможности образования в формировании системы отношений. Актуальные Научные Исследования в современном мире. Выпуск 3 (23), Часть 1.
18. Мардахаев Л.В. (2006) Социальная педагогика. Москва,Гардарики.
19. Плоткин М.М. (2003) Социальное воспитание школьников. Москва.
20. Шишов С. (1999) Мониторинг качества образования в школе. Москва.